# Molla Nəsrəddin



# ملّانصرالدّین

E-kitab halına saldı: Cavid Ağa

*Pəncşənbə, 29 cəmadiüs-sani* **On altımcı il** 20 hut 1299

# ملا نصر الدين

# MOLLA NƏSRƏDDİN

*Şümarə 2* *Qiymәti satıcı әlindә on altı şahı* № 2

**Ağayı - buzurgvar mədrəsə müdirlərini çağırıb soruşur:**
**Aya, fukul və başı tüklü qoymaq elmi artıran şeydir, ya yox?**



**Cavab verdilər ki: Xeyr!**

**Bu səbəbdən ağa fərmayiş edib müəllimlər fukuli və baş tükünü götürüb əba örtsünlər**





**Urmidə**

Təbriz geravürsaziye Hüseyni


**Abunə qiymәti:**

| | |
|---|---|
| *İlliyi* | *40 qran* |
| *Yarım illiyi* | *22 qran* |
| *Tək nüsxəsi satıcı əlində* | *16 şahı* |

*Əcnəbi məmləkətlərə illiyi 60 qran*

***Hər həftə nəşr olunur***

**Məhəlli idarə:**
Təbriz, bazari - usta şagird, xanəyi şahzadə Nüsrətüssəltənə

*Teleqraf və post ünvanı: Təbriz, "Molla Nəsrəddin"*


## ƏDƏBİYYAT

### *Təzə ayı görəndə lazımdı gözlərivü yumub aşağıda ad verilən şeylərə baxasan, amma bu şeyləri tapmayınca məbada gözlərivü açasan*



*Məhərrəm zər əstü səfər ayınə — Bu mənanı lazımdı təfsir edəm*

*Qızıldır gəlir hey dolur ciblərim — Rəbi nəxüst ab, digər qənəm*

*Cəmadi nəxüstin puldır səfid — Ticarətdə çox yaxşı işlər tələm*



*Zəmani ki oldum qəni, maldar — Cümadiye-degər bir kəsi möhtərəm*

*Rəcəb müshəf, mahi-şaban beküll — Mahi-ruzəda çoxdu söz lacərəm*

*Gecə, Ermənistan, qızlar qəşəng — Qaşı misli-tiği-cahandari-Cəm*



*Çü şəvval gəldi bir az səbzə al — Be ziqədə bir tiflə eylə kərəm*

*Əgər övrətin üçdüsə fərzdir — Be zihəccə didari-zibasənəm.*

*İmza: Kabla Haxverdi*

# FİRQƏLƏR DAVASI

Allah ölənlərinizə rəhmət eləsin, rəhmətlik nənəm İranın firqələr davasından qəribə hekayələr elərdi. Mən onda uşaq idim, ağlım kəsmirdi, amma indi bilirəm ki, o vədələr İranda necə qəribə-qəribə firqələr var imiş.

Rəhmətlik nənəm nağıl eləyərdi ki, 150 il bundan əqdəm ki, İran indiki vaxtından bir az qaranlıqda imiş, - o və'də İranda indiki elm, maarif və təməddün yox imiş. O və'dələr azadixah firqələr də var imiş, yə'ni o və'dələr sosyal-demokrat da var imiş, demokrat da var imiş, ittihadi-islam da var imiş, tənqidiyyun da var imiş, e'tidal da var imiş və 72 min yaxud 72 mücahid əncüməni var imiş. Allah bərəkət vermiş bu firqələrin özgə bir vəzifəsi yox imiş, məhz bir-birini əzib yox eləmək fikrindən savayı.

Mən onda uşaq idim, rəhmətlik nənəmdən soruşardım ki, "ay nənə, bəs məgər o flrqələr azadixah deyilmişlər?". Nənəm deyərdi: "Bəli, bəli, azadixah fırqələr idi". Mən deyərdim: "Ay nənə, vallah başa düşmü-rəm; çünki uşağam, ağlım kəsmir. Amma bizim mədrəsə kitablarımda yazılıb ki, azad bir məmləkətdə hər bir şey azaddır və məslək də o cümlədən". Nənəm deyərdi ki, "ay bala, doğru deyirsən, amma o və'də azadlıq elə ona deyərdilər ki, hansı firqə ki, güclü oldu və iş başına keçdi, qeyri zəif firqələri əzib yox eləməyə azad imiş".

Mən deyərdim: "Nənə, axır, mən eşitmişəm ki, əcnəbi məmləkətlərdə belə deyil. Məsələn, bir məmləkət ki, özünü azad hesab eləyir, orada hər bir firqə özü üçün təşkilat əmələ gətirib, hey'ətini aşkar surətdə meydana qoyur və bu firqələrin hansı birisi ki, qüvvət tapıb, hökumətə sahib olur, digər fırqələri nəinki yox eləmək fıkrinə düşmür, bəlkə haman fırqələrdən hökumət idarəsinə nümayəndə də'vət edib, məmləkəti koalisiya surətində idarə eləyir".

Yadımdadır ki, mən bu sözləri deyəndə rəhmətlik nənəm qabaqca əsnərdi, sora deyərdi: "Lə'nət sənə kor şeytan", sora da deyərdi:

- Bala, dur yerini salım yataq, gecədən çox keçir.

Allah sizin də ölənlərinizə rəhmət eləsin.

*Molla Nəsrəddin*

# E'LAN

Ba emzaye rəfiq Sandüqülmülk elane zeyl bəraye sənəd be idare reside əst. Hər kəs mixahəd be bəzi dəvayere ədliyye rücu nəmayəd bayəd əvvələn darayiye xod ra qəblən beforuşəd və bəraye roşvət nəqdən hazer darəd. Saniyən yek vərəse ya vəkili təyin nəmayəd ke əgər mohakeme dər moddəte omr təmam nə başəd anha təğib nəmayəd və bayəd səy konəd vəkil əz vokəlayl başəd ke dəstək və dəllale bəzi əz sahibane məqame aliye ədliye başəd.

Alçaq təbəqələri iş başına keçirmək bədyəməndir, girəm ki, alim və şərafətli şəxslər də olmuş ola.

## MAARİF DOSTLARINA BƏŞARƏT

Cəmadiüs-saninin on doqquzunda düşənbə günü maarifin təravici yolunda elə bir binagüzarlıq olunub ki, İran tarixində bunun misli yada düşmür.

Həmin gün millətin təlaşı və hökumətin müsaidəti sayəsində qərar qoyulub şəhri-Təbrizdə və Azərbaycanın sair şəhərlərində və qəryələrində min iki yüz təzə mədrəsə təsis olunsun: beş yüz mədrəsə Təbrizdə və yeddi yüz mədrəsə kənar nöqtələrdə.

Bu min iki yüz mədrəsəyə ayda iki yüz qırx min tümən məxaric tə'yin olunub ki, hər mədrəsəyə təqribən ayda iki yüz tümən düşür.

Mədrəsələr beş klaslı, milli və məccani olacaq. Beş müəllim, hərəsi demokrasi üsulilə müsavi surətdə otuz tümən ayda hüquq aparacaq, qalan yüz tümən mədrəsənin qeyri ləvazimatına xərc olunacaq.

Bu min iki yüz mədrəsənin altı min müəllimi hazırda mədrəsədə təhsil eləmiş cavanlardan intixab olunacaq və bunları müəllimliyə hazır etmək üçün beş yerdə darülmüəllimin bina olunacaq: üçü Təbrizdə, biri Ərdəbildə və biri də Marağada.

Həmin təşkilat dövlət xəzinəsi öhdəsində əmələ gəlir və çün, necə ki, məlumdur, dövlət xəzinəsi pulsuzdur, bu müqəddəs iqdamatı icra etmək üçün belə bir ali tədbir ittixaz olunub:

### İdarələri milliləşdirmək

Təqlili-məxaric babətindən idarələrin yuxarı mərtəbələrində məqam tutan dövlətmənd, yə'ni ə'yan və əşrafı kənar edib millətin aşağı təbəqələrindən elmli və şərafətli cavanları onlarla əvəz etmək və nəcabətli ağalar aldıqları hüququ üç yerə qismət etmək: bir qismini tazə milli mə'murlara tə'yin etmək və bir qismətini tazə təsis olunan mədrəsələrin büdcəsinə daxil etmək.

Həmin bu barədə hökumətin qərardadına binaən dövləti idarələrdə ayın iyirmi birindən təbəddülat iqdamatı başlanacaq.

Birinci növbədə ümurati-maliyyədir ki, necə ki məlumdur, ən əvvəl xəzinədən ağır bir pul götürən həmin idarati-maliyyədir.

Bu təfsilatı yazmaqda məqsəd, əvvələn, cəmi maarifpərvər qardaşlara bəşarət verməkdir.

Saniyən, cəmi millət dostlarını təbrik etməkdir ki, zəmanənin müqtəziyyatı sayəsində bizim də biçarə millət axırda yada düşüb adamlar cərgəsinə qoyuldu ki, bundan sora inşaallah-təala bir idarəyə yolumuz düşsə, orada yuxarı başda əyləşən ağalar içində bizim də alim və şərafətli, qənaətkar cavanlardan gözümüzə sataşacaq.

*Yaşasın millət!*

*Hərdəmxəyal*

## XƏBƏR ƏZ MARAĞA

Müddəte do mah əst dər xəyale təsise do bab (Darülçərs) və (Darülbəng) oftadə ənd. Şüru be təşkilat şode. Moddəte do sal doureye təhsil (Darülçərs) bude, bəd əz etmam və imtahan dər hozure professorhaye motəxəssis se sal həm dər (Darülçərs) məşğule təhsilat xahənd şod. Bəd əz giriftəne şəhadətname məzunine in mədrəse dər bəzi edarate dövlətiye Təbriz, bexüsus dər bəzi dəvayere ədliyyeye əyalati məqame ali ra hayez xahənd bud.

Dövləti idarələrdə əyan və əşrafın varlığı vətənin bir zinətidir, girəm ki rüşvətxor da olalar.

**SANDÜQÜLMÜLK**

İdarəmizə şəhər postasından Sandüqülmülk imzası ilə bu məzmunda bir məktub gəlib ki, onu aşağıda dərc eləməyi lazım bilirik.

**Cənabi-Axund Molla Nəsrəddin**

Bəndeyi-həqir, yə'ni sabiq ədliyyə rəisibədayəti Sandüqülmülk, necə ki, mə'lumdur bir az vaxt bundan əqdəm öz vəzifəmdən mə'zul oldum……..qaçam…………………….

Bu bir neçə sətri yazmaqdan məqsəd Molla əmiyə izhar etməkdir ki, mənim barəmdə nəhayət zülm oldu, zira ki, məni müqəssir tuturlar ki, mən təqribən otuz min tümən ədliyyəyə dəxil düşən camaatdan əz babətirüşvət alıb dördüncü həzmdən keçirtmişəm, yə'ni be istilahi-türk demişkən lap açığı; yə'ni yemişəm.

Bəli, ağa, səhihdir, almışam və yemişəm. Və lakin bircə bunu istəyirəm səndən soruşam ki, aya görək idarələrdə rüşvət alan tək bir mənəm, ya məndən savayı da var? And olsun bizim hər ikimizi yaradan Allaha ki, mənim kimi vətən xadimləri bu saat Təbrizin dövləti idarələrində çox-çoxdur, əgər mənim sözümə etibar etməsəz əhd edirəm dübarə yazı ilə haman ağaların siyahısını yazıb genə şəhər postu ilə göndərim.

Əgər rüşvət almaq yaxşı şeydir, nə səbəbə məni öz vəzifəmdən ixrac elədilər? Əgər pis şeydir, bəs o xain ağaları niyə mənim kimi qulluqdan kənar edib onların yerinə saf və sadiq şəxsləri tə'yin etmirlər?

Üzr istəyirəm ki, artıq dərdi-sər oldu.

*Sizə duagu Sandüqülmülk*



**MƏARİFPƏRƏSTLƏR**

Eşitdiyimizə görə Təbrizin böyük tacirlərindən yeddi nəfər bir yerə cəm olub və şərakətən pul qoyub "Rəd" ruznaməsinin üç aylığına müştəri yazılıblar. Camaatımızın maarif dostluğuna bu bir böyük dəlildir və ümidvarıq ki, bundan sora ruznamələr o qədər tərəqqi tapalar ki, şəhərimizdə "Rəd"in ya qeyri ruznamənin nıüştərisi ki, indi cəm'ən iki cüt bir təkdür, bəlkə bundan sora üç cüt bir tək ola.

*Yaşasun maarif dostları*

Vəbalı mənim boynuma, kasıb adamı iş başına keçirtmə, əgər qeyrətli və sədaqətli və elmli də olmuş ola

**TİKAN**

Bir gün bizə bir əbalı qonaq gəldi və salam verib istədi otura. Mən də istəyirdim oturam, birdən gördüm qonaq birdən dik durdu ayağa. Mən çox xəcalət çəkdim, çünki xəyalıma gəldi ki, nökərimiz evi süpürəndə süpürgənin tikanı düşüb fərşin üstünə və batıb qonağın yumuşaq yerinə. Mən çıxdım dalana və nökəri çağırdım və

başladım məzəmmət eləməyə ki, ey namərd, sən niyə məni xəcalət eləyirsən ki, evi süpürəndə süpürgənin tikanını fərşin üstünə salırsan?

Nökər and-aman elədi ki, süpürgənin elə bir tikanı yoxdu ki, yerə düşə və xəlqin canına bata.

Xülasə, girdim içəri və istədim oturam. Oturan kimi genə qonağımız birdən dik qalxdı. Mən bu dəfə doğrusu, lap xarab oldum və qeyzə gəlib genə çıxdım nökəri çağırdım və genə başladım məzəmməti və genə girdim içəri və genə istədim oturam, genə qonağımız dik atıldı durdu ayağa.

Mən bu dəfə dəxi qızara-qızara başladım qonaqdan üzr istəməyə ki, bu Təbrizin ev qulluqçuları çox bitərbiyə və biqabiliyyətdirlər ki, adamı belə bir əziz vücudların yanında utandırırlar. Qonağınıız bir söz demədi və başladı məndən əhvalpürsanbq eləməyə.

Bu heyndə dostlarımdan bir nəfər otağa daxil oldu və istədi otura və yerə çökən kimi, qabaqkı qonağımız genə dik atıldı. Mən dəxi həqiqət pərişan oldum və yavaşca dostuma işarə edib, durdum ayağa və çıxdım çölə, dostum da mənim dalımca gəldi. Mən dalanda dostumu çağırdım və mətləbi məhrəmanə bəyan elədim, dedim ki:

- Bu otaqda əyləşən möhtərəm vücudun yanında mən şərmsar olmuşam və bilmirəm nə vəsilə ilə ondan üzrxahlıq edim. Dostum dedi:

- Nə var və nə vaqe' ittifaq düşüb?

Mən tikan məsələsini dostuma ərz elədim. Amma həmin sözü eşitcək dostum qah-qah çəkib güldü və gülüb qurtarandan sonra belə fərmayiş elədi:

- Əzizim, Molla əmi, sən bu vilayətin çün vəz'inə bələd deyilsən, onun üçün sənə belə iştibahlar üz verir. Mətləbin vazehi budur ki, həmin möhtərəm əbalı qonağın altında tikan-zad yoxdur və nökəri nahaq yerə incidirsən, səbəb budur ki, bizim yerdə ata-babadan belə bir qayda var ki, məclisdə əyləşmək istəyəndə, o biri şəxsin vəzifəsidir ki, yerindən dursun ayağa. Sən yə'qin ki, hər dəfə əyləşmək istəmisən, həmin qonaq sənə ehtiram göstərmək babətindən qalxıb ayağa, yoxsa arxayın ol ki, onun yumuşaq yerinə tikan zad batmayıb.

Mən barmağımı dişlədim və mətləbi başa düşdünı, amma dostuma dedim ki:

-Xub, mən axır bir dəfə yox, üç dəfə gördüm ki, qonaq dik atddı.

Dostum cavab verdi ki:

-Bəli üç-dörd dəfə səhldir. Sən səhərdən axşama kimi iki yüz dəfə də oturmaq istəsən, sənin əbalı qonağm yerindən həmin sayaq dik atılıb duracaq və sən həmin qərarnan iki yüz dəfə elə xəyal eliyəcəksən ki, qonağın yumuşaq yerinə tikan batıb. Yoxsa nökərdə günah yoxdur. Təbriz süpürgəsinin tikanı olmaz.

Mən o günü çox fikrə getdim...

*Mozalan*

Əgər ə'yan və əşrafı dövləti idarələrdə hissli və məlumatlı və lakin kasıb mə'murlara əvəz eləsək əlbəttə vətən əldən gedər

## BİR DAMCI

*Can Gülsənəm, əzizim, – ay xoş gəlibsən, ay qız,*
*Kefsizləyibdi Heydər – həm acdı, həm də çaysız.*
*Çün göz vurub uşağa – bir bədnəzər ad, ay qız.*
*Tapsan üzərrik, əlan,*
*Bir damcı göndər ondan.*

*Ürbabənin də neylim – artıbdı köhnə dərdi,*
*Birdən tutanda sancı – doxtur, təbib hədərdi,*
*Mələkəzrəq ilə xaşxaş – olsaydı, tez kəsərdi,*
*Gər sizdə varsa, qurban,*
*Bir damcı göndər onnan.*

*Bir söz də qaldı, ay qız, – gər haxdı sən də haxla,*
*Sizdə bişərsə gahı, – şor su içində paxla,*
*Ta şişməsin iyindən – bir az çağama saxla.*
*Çün şişsə yoxdu dərman*
*Bir danıcı göndər onnan.*

*Hərdən də bir mənim də – ağrır bəlalı başım,*
*Gah elə şiddət eylər, – sancar gözümlə qaşım,*
*Çeynə, deyərdi, saqqız – mərhum Kabla Haşım,*
*Bacı, qəsəm be Qur'an,*
*Bir daıucı göndər onnan.*

*İmza: Dabanı çattax xala*

## CAVANLARA

Bircə ümidim cavanlara idi. Həmişə və hər bir məkanda vətən məhz cavanlardan öz nicatını gözləyib. Mən də bu səbəbdən məhz cavanlanlarımıza ümid bağlayırdım. Mən onlara dedim: "Xub, həftənin altı gününü öz kəsbi-karınıza məşğul olub, ama tək bircə gününü verin mənə. Bəlkə həftədə bircə gün də olsa, əl-ələ verək və Allah bədnəzərdən saxlasa, vətən yolunda, eyb olmasın, bir az xidmət edək". Cavanlar dedilər: "Xub, biz hazırıq". Mən də müntəzir oldum. Pəncşənbə günü cavanları gözlədim, gəlmədilər. Dedim bəlkə cümə günü yığışacaqlar. Cümə günü də gördüm ki, gəlmədilər, çıxdım küçəyə və küçəyə çıxdıqda nə gördüm? Gördüm ki, haman cavanlar Ermənistanda gəzirlər, ama nə halətdə? Gözləri qızarmış.

- Ağa, niyə gözləriniz qızarıb?

Cavab verdilər kı, "Molla əmı, Allahdan gizlin ki deyil, səndən niyə gizlin ola? Gecəni yatmamışıq".

- Niyə yatmamısınız? Nəyə məşğul idiniz?— qumara? Nəyə?

- Qumara və məşrubata.

- Nəyə?

- Qumara və içkiyə, yə'ni kefə.

Bəli, dəxi sözüın qurtardı. Ancaq cavanlardan bir müxtəsər giley-güzar eləmək istədim, istədim bunu deyəm ki, hər bir məmləkətdə millətin ümidvarlığı məhz cavanlar olublar. Ama bizim müqəddəs ölkəmizdə (Allah şeytana lə'nət eləsin) işlər necə tərsinə düşüb ki, hacı və məşədi övladının pəncşənbə axşamı və cümə gecələri sübhədək gözəl vəqtləri nəyə sərf olur, nəyə? Qumara, arağa.

Bu da vətənin bəxtindəndır ki, cümə günü hər bir cavanın üzünə ki, baxırsan, gözlərini qan çanağı kimi qızarmış görürsən. Dəxi başına nə daş salsın biçarə vətən? Onunçun qoca vətən cavanlara baxanda ağlaya-ağlaya deyir: "Driğa cəvani, driğa cəvani".

*Lağlağı*

## POST QUTUSU

**Təbrizdə "Fəqir"** imzası ilə yazana: yazdığın mətləb indi çap oluna bilməz.

**"Şairi-Biqərəz"ə:** – hərçənd imzan "Biqərəz"dir, ama şerlərin qərəz babətindən yazılıb.

**"Nadir"ə:** - çap olunmaz.

**"Divanə"** imzası ilə yazana: – "Hacı Haşım" sərlövhəli məqalədən bir şey başa düşmədik.

---

Müdir və sərmühərrir: Cəlil Məmmədquluzadə

*Vəkillərimiz: Təbrizdə—Dəme hərəmxane, "Hüseyni" mətbəəsi.*
*Dəme məqbərə, tovziye—cərayed.*
*Daş mağazalarda Qulu xan dərzi.*

Təbriz, mətbəeye—mehrzərrin
və geravürsaziye—"Hüseyni".













*Sarabda buğdanın xərvəri yeddi tümən, Ərdəbilə çatanda olur on iki tümən, dörd yerdə səlamətyana istəyirlər*